# REFERAT, DİPLOM İŞİ, MAGİSTR DİSSERTASİYASI

***Referat*** hər hansı elmi işin, problemin öyrənilməsi və nəticəsi haqqında yazılı şəkildə qısa xülasə, eləcə də müvafiq ədəbiyyat, məxəzlər əsasında müəyyən mövzuda edilən məruzədir. Bir qayda olaraq, elmi məlumat xarakteri daşıyır, əslində lüğəvi mənası latınca "məruzə etmək, məlumat vermək, hər hansı məsələ ilə bağlı, bir və ya bir neçə kitab, monoqrafiya haqqında, ilkin mənbələr əsasında, qısa və dəqiq icmal" deməkdir; referat müxtəlif mənbələr və müəllif nəticələri əsasında ideya, konsepsiya, nöqteyi-nəzər və baxışların ümumiləşdirilmiş formasıdır.

Referatın strukturu belədir:

**Titul vərəqi. Mündəricat. Giriş. Fəsillər. Paraqraflar, yarımbaşlıqlar və bəndlər. Nəticə. Əlavələr. Biblioqrafiya (ədəbiyyat siyahısı).**

Referat elmi səciyyə daşıdığından akademik üslubda yazılır, fikrin ifadəsində şablon ifadələrdən istifadə olunur. Referat yazılarkən elmi üslubdan kənara çıxmaq olmaz, məişət üslubuna aid söz və söz birləşmələrindən, milli söz əvəzinə lazımsız halda əcnəbi sözlərdən istifadə düzgün sayılmır.

Titul vərəqindən sonra gələn mündəricatda bütün struktur bölmələri planauyğun şəkildə səhifə başlıqlarının yerini bildirən nömrələnmiş formada öz əksini tapır. Referata məxsus növbəti vərəqdə 1,5 - 2 səhifə həcmində giriş yazılır. Giriş referatın başlanğıc, oxucunu tədqiq olunacaqlara hazırlama hissəsidir. Burada tədqiqatın məqsədi, aktuallığı, nəzəri və praktik əhəmiyyəti, problemin mahiyyəti, fərqləndirici xüsüsiyyətləri, həll mürəkkəbliyi, elmi-təhlil tələbləri, öyrənilmə istiqamətindəki aspektlər əsaslandırılır, mövcud tədqiqatla bağlı görülmüş işlər sadalanır.

Referatın əsas hissəsi 2 – 3 paraqrafı (yarımbaşlıq və bəndlər) əhatə edə, bir və ya bir neçə fəsildən ibarət ola, əsas ideyalar məntiqi təqdimatda verilə bilər.

Sitat gətirildikdə, rəqəmli material və cədvəllərdən istifadə edildikdə hökmən ilkin mənbələrə və müəllifə istinad olunmalıdır.

Referatın sonunda tədqiqatın əsas suallarını cavablandıran, əldə olunmuş nəticələr əks etdirilir, həmçinin mövzunun sonrakı perspektiv inkişafını səciyyələndirən istiqamətlərə yer ayrılır. Referat istifadə edilmiş ədəbiyyat siyahısı ilə bitir, kitab və məqalələr, habelə internet saytlarının siyahısı, rekvizitlər əlifba sırası ilə yazılır.

Referatın həcmi 20-25 səhifə olmaqla, kompüterdə (format Word) çap olunur:

–formatı - A4 (210 x 297 mm);

–şrift: Times New Roman – 14.

Bütün xətlər, hərflər, rəqəmlər, işarələr aydın və eyni qara çalarlıqda olur, səhifələri ərəb rəqəmləri ilə nömrələnir. Səhifələr nömrələnərkən titul - üz vərəqi də nəzərə alınır. Titul vərəqindən sonra gələn səhifədə *2* rəqəmi, sonrakı səhifələrdə isə

ardıcıl nömrələr səhifənin yuxarı sağ küncündə yazılır. Səhifələr (əlavələr, arayışlar, aktlar və s. daxil olmaqla) ardıcıl olaraq nömrələnir.

İstifadə olunmuş ədəbiyyat siyahısına daxil olan bütün nəşrlər ərəb rəqəmləri, fəsillər rum rəqəmləri ilə ardıcıl olaraq nömrələnir (məsələn: I FƏSİL). PLAN, GİRİŞ və NƏTİCƏ hissələri nömrələnmir, lakin ümumi sıralanma nəzərə alınır.

Referatın mətnində istifadə olunmuş böyük həcmli mənbələr ədəbiyyat siyahısında əlifba sırası ilə yazılır və nömrələnir. İstifadə edilmiş mənbələr çap olunduqları dillərdə (əvvəlcə: Azərbaycan, sonra türk, rus, ingilis, fransız, ərəb və s.) əlifba sırası ilə yazılır və ardıcıl nömrələnir. İstifadə edilmiş ədəbiyyat siyahısında son 5 - 10 ilin ədəbiyyatına üstünlük verilir.

## Diplom (buraxiliş) işi

Diplom işinin yazılma qaydaları akademik yazı standartları ilə tənzimlənir. Diplom işi bakalavr və magistratura dərəcəsinin qazanmaq üçün yazılan elmi-tədqiqat işidir, elmi yazı kateqoriyasına aiddir və digərləri kimi fərqli qaydalara, hədəflərə malikdir. Bakalavr dərəcəsi üçün 35-40, magistratura üçün 70-80 səhifəlik elmi iş tələb olunur. Lakin bu tələblər müəyyən ixtisaslar üçün keçərli olmaya da bilər. Məsələn, memarlıq və ya mühəndislik ixtisasları üzrə yazılan diplom işləri bir qədər hesabat xarakteri daşıdığı üçün qısa olur, nəticədə məzun diplom işini əvəz edəcək layihə hazırlayır və dərəcəni qazanır.

*Elmi iş yazarkən fikir parafrazından – plagiatlıqdan uzaq olmaq lazımdır. Plagiat "başqasının fikir və ya işlərindən istifadə edərək özünə aid olduğunu iddia etmək", konkret olaraq: başqalarına aid fikirləri özəlləşdirmək, fikir oğurluğudur. Elmi işin məqsədi tədqiqat aparılması, mövzunun dərindən öyrənilməsi və elmə yeni bir tövfə verilməsidir. Plagiat isə bunların qarşısını alır və nəticədə tələbə heç nə öyrənə bilmir, özünü aldadır.*

## Diplom işinin quruluşu, hazırlanması və məzmunu

Buraxılış işi aşağıdakı quruluşda tərtib olunur:

–titul vərəqi ( təsisçi, təhsil müəssisəsi, fakültə, istiqamət və ya ixtisas, mövzunun adı, işin rəhbəri, tələbənin adı göstərilməklə);

–buraxılış işinin tapşırıq vərəqi;

–referat;

–mündəricat;

–giriş;

–tapşırığın müəyyən olunmuş əsas hissəsi;

–yekun nəticə və ya təkliflər;

–istifadə olunmuş ədəbiyyatın siyahısı;

–əlavələr (əgər nəzərdə tutulubsa)

Buraxılış işinə ümumi tələblər və tərtib olunmuş qaydaları ali təhsil müəssisəsinin kadr hazırlığının profilinə uyğun hazırlanır və onun elmi şurasında təsdiq edilir. İstiqamətdən (ixtisasdan) asılı olaraq onun həcmi 1,5-2,5 çap vərəqi hüdudunda olur. Buraxılış işləri əlyazma kompüter çapı şəklində təqdim olunur. Buraxılış işlərinə rəhbərlərlə yanaşı bir nəfər mütəxəssis də rəy verir. Buraxılış işlərinin məzmunu ali məktəblərin bakalavr pilləsi ixtisaslarının dövlət standartı ilə müəyyən olunmuş tələblərinə cavab verməlidir.

## Magistrlik dissertasiyası

Magistrlik dissertasiyası – magistratura tələbəsinin, yaxud deyə bilərik magistrantın müstəqil elmi-tədqiqat işinin məhsuludur. Magistrlik dissertasiyası işinin icrası və müdafiəsi magistranta təhsil illəri ərzində qazandığı bilikləri sistemləşdirməyə, möhkəmləndirməyə, ixtisas üzrə nəzəri biliyini və praktik bacarığını daha da genişləndirməyə, konkret elmi-pedaqoji, texniki, iqtisadi, istehsal və digər məsələləri həll etməyə imkan verir, onlarda müstəqilliyi, yaradıcılığı inkişaf etdirir, elmi tədqiqat metodlarından istifadə etmək və eksperiment qoymaq qabiliyyətini aşılayır. Magistrlik dissertasiyası sırf müstəqil elmi-tədqiqat xarakteri daşısa da bu əsas etibarilə tədris-tədqiqat işlərinə aid olur. Magistrant yazdığı dissertasiya işinin əsas mahiyyətini, mövzunun aktuallığını, tədqiqatının əsas istiqamətlərini, elmi yeniliyini, nəzəri və praktik əhəmiyyətini əldə etdiyi nəticələri sərbəst və müstəqil olaraq şərh etməyi bacarmalıdır.

Dissertasiya təlim dilində yazılmalı və müdafiə edilməlidir. Magistrlik dissertasiyasının strukturunu aşa ğıdakı ardıcıllıqla yerləşdirilmiş materiallar təşkil edir:

–titul vərəqi;
–referat;
–içindəkilər;
–giriş;
–əsas hissə (dissertasiyanın məzmunu);
–nəticə;
–istifadə olunan ədəbiyyat;
–əlavələr (əgər varsa).

Titul vərəqi dissertasiyanın birinci səhifəsidir və onun nümunəsi magistrlik dissertasiyasının yazılması üçün qəbul edilmiş qaydalar məcmuəsində göstərilir.

Referat dissertasiyanın məzmununun qısa xülasəsidir və orada aşağıdakılar əks olunmalıdır:

–magistrantın adı və dissertasiya işinin mövzusu;

–tədqiqatın obyekti, məqsədi və xarakteri;
–tədqiqat v ə hesablamaların qısa şərhi;
–nəticə

Referatın həcmi təxmin ən 150-200 sözdən ibarət olmalıdır. İçindəkilər dissertasiya işində olan bütün fəsillərin, hər fəslə daxil olan başlıqların və alt başlıqların hansı səhifələrdən başlandığını göstərir.

Girişdə mövzunun aktuallığı, tədqiqatın məqsədi və obyekti haqqında qısa məlumat verilir.

Əsas hissədə dissertasiya işində müvafiq elmi istiqamət üzrə mühüm əhəmiyyəti olan və araşdırılan məsələnin təhlili və onun yaradıcı həlli verilir. Əsas hissənin mətni fəsil, başlıqlar və alt başlıqlara bölünür. Burada lazım gəldikdə cədvəllər, şəkillər, qrafiklər, diaqramlar, sxemlər və s. verilə bilər.

Nəticə hissəsində tədqiqat işinin yekunu olaraq magistrantın əldə etdiyi elmi və təcrübi nəticələr və tövsiyələr verilir.

İstifadə olunan ədəbiyyat hissəsində dissertasiya işini yerinə yetirdikdə istifadə edilmiş bütün mənbələr bir qayda olaraq əlifba sırası ilə (müəllifin soyadının birinci hərfi) ardıcıl nömrələnərək göstərilir (bəzi hallarda mənbələr istinadlara görə də nömrələnə bilər). Müəllifinə və ədəbiyyatına istinad olunmadan özgə materiallarından istifadə edildikdə, magistrlik dissertasiyası müdafiə ilə bağlı istənilən müzakirə mərhələsindən geri qaytarıla bilər.